QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Sentyabr 2017 № 5 (1084)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## "Azərbaycan gəncliyi 2017-2021-ci illərdə" Dövlət Proqramının təsdiq edilməsi haqqında

## Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 3-cü bəndini rəhbər tutaraq **qərara alıram:**

1. "Azərbaycan gəncliyi 2017-2021-ci illərdə" Dövlət Proqramı" təsdiq edilsin (əlavə olunur).

2. Azərbaycan Respublikasının Gənclər və İdman Nazirliyi:

2.1. bu sərəncamın 1-ci hissəsi ilə təsdiq edilmiş Dövlət Proqramında nəzərdə tutulan tədbirlərin həyata keçirilməsini əlaqələndirsin;

2.2. Dövlət Proqramında nəzərdə tutulan tədbirlərin icrasının gedişi barədə ildə bir dəfə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin.

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 15 sentyabr 2017-ci il*

# Elmi Şuranın iclası

Sentyabrın 8-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının 2017-2018-ci tədris ili üçün ilk iclası keçirilib. ADPU-nun rektoru, Elmi Şuranın sədri, professor Cəfər Cəfərov iclası giriş sözü ilə açaraq Şura üzvlərini yeni tədris ili münasibətilə təbrik edib, uğurlar arzulayıb. Rektor bildirib ki, iclasın gündəliyinə Elmi Şuranın 2017-2018-ci tədris ili üçün iş planının təsdiqi, "2016-2017-ci tədris ilinin yaz-yay imtahan sessiyalarının nəticələri və 2017-2018-ci tədris ilinə hazırlığın vəziyyəti haqqında", "2017-2018-ci tədris ili üçün bakalavriat və magistratura səviyyələrinə qəbulun nəticələri haqqında" və cari məsələlər daxildir.

Elmi katib, siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundov Elmi Şuranın 2017-2018-ci tədris ili üçün iş planı barədə məlumat verib. İş planı Elmi Şura tərəfindən təsdiq edilib.

Tədrisin İdarə Olunması və Tədris Texnologiyaları Mərkəzinin direktoru, dosent Sənan Əliyev "2016-2017-ci tədris ilinin yaz-yay imtahan sessiyalarının nəticələri və 2017-2018-ci tədris ilinə hazırlığın vəziyyəti haqqında" məruzə ilə çıxış edib. Dosent S.Əliyev bildirib ki, tədris prosesinin tərkib hissəsi kimi yaz semestrinin imtahan sessiyasını normal mənəvi-psixoloji şəraitdə, şəffaf və obyektiv keçirmək üçün bütün hazırlıq işləri və təşkilati məsələlər vaxtında yekunlaşdırılmışdır. İmtahanların aparılması üçün lazımi sənədlər, imtahan vərəqləri tələblərə müvafiq hazırlanmışdır. ADPU-nun rektoru, professor Cəfər Cəfərov imtahan sessiyasına hazırlıqla bağlı fakültə dekanlarının, kafedra müdirlərinin və digər aidiyyəti qurumların həyata keçirəcəkləri vəzifələri müəyyən edən 01.05.2017-ci il tarixli 3/74 nömrəli əmr imzalamışdır.

Yaz semestrinin imtahan sessiyasında imtahanların yazılı və VTS-TEST sistemi ilə aparılmasına nəzarəti təmin etmək məqsədilə nəzarətçi müəllimlər və imtahan rəhbərləri təyin olunmuş, eyni zamanda imtahan prosesində mümkün narazılıqların araşdırılması məqsədilə fakültələr üzrə apelyasiya komissiyaları yaradılmışdır.İmtahan sessiyasının şəffaf və obyektiv keçirilməsi, imtahanların gedişində yarana biləcək mənfi halların qarşısının alınması, yol verilən nöqsanların vaxtında aradan qaldırılması, imtahanların gedişi ilə bağlı daxil olan ərizə, şikayət və təkliflərin çevik araşdırılması və vətəndaşların müraciətlərinə vaxtında baxılmasını təmin etmək məqsədilə universitetdə İmtahan Qərargahı və Apelyasiya Komissiyası yaradılmışdır. İmtahanqabağı kollokviumlar fənn müəllimləri tərəfindən və kompüter vasitəsilə keçirilmişdir. İmtahanların keçirilmə müddəti tədris planlarına və tədris prosesinin qrafikinə uyğun tərtib edilmiş və təsdiq olunmuş cədvəl üzrə aparılmışdır. Bakalavriat səviyyəsində I tədris ilinin tələbələri üçün yazılı formada, II-IV tədris ilinin tələbələri üçün isə spesifik fənlər istisna olmaqla, imtahanlar kompüter vasitəsilə test üsulu ilə, magistratura səviyyəsində isə imtahanlar yazılı şəkildə aparılmışdır. Semestr və dövlət imtahanlarında mütəşəkkilliyin təmin olunması məqsədilə universitet üzrə İmtahan qrupu yaradılmış, bütün imtahanlarda şəffaflığın və obyektivliyin təmin edilməsinə nail olunmuşdur.

Yaz semestrinin imtahan sessiyasında İmtahan Qərargahına ümumilikdə 109 müraciət daxil olmuşdur. Həmin müraciətlərin təxminən 34%-i imtahan qaydalarının pozulması ilə bağlı olmuşdur. VTS-TEST sistemi ilə bağlı 14 müraciət daxil olmuşdur ki, bu da tələbələrin müxtəlif səbəblər nəticəsində "qara siyahıya" düşməsindən irəli gəlmişdir. Bütövlükdə İmtahan Qərargahına daxil olan müraciətlər çevik araşdırılmış və müvafiq qərarlar qəbul edilmişdir.

İmtahan sessiyası dövründə Apelyasiya Komissiyasına 1241 müraciət daxil olmuşdur.



Apelyasiya Komissiyasına edilən müraciətlərin 538-i (təqribən 43%-i) müsbət həll edilmiş, 703 (təxminən 57%) müraciətdə isə tələbələrin qiyməti qüvvədə saxlanılmışdır. Yaz semestrində universitetdə bakalavriat səviyyəsində əyani şöbədə 8981 nəfər tələbə təhsil almışdır. Onlardan 8848 nəfəri imtahanlarda iştirak etmişdir. 7650 nəfər tələbə imtahanları müvəffəqiyyətlə vermişdir. Onlardan 176 nəfəri "əla", 780 nəfəri "əla", "çox yaxşı", "yaxşı", 6694 nəfəri qarışıq qiymətlər almışdır. 1198 nəfər imtahanlardan qeyri-müvəffəq qiymət almışdır. Yaz semestrinin imtahan sessiyasının yekunlarına görə əyani təhsil forması üzrə müvəffəqiyyət 86%, keyfiyyət 11% olmuşdur. Ötən ilin müvafiq dövründə müvəffəqiyyət 86%, keyfiyyət 5% olmuşdur. Bakalavriat səviyyəsində qiyabi təhsil formasında 669 nəfər tələbə təhsil almışdır. İmtahanlarda iştirak edən 639 nəfərdən 560 nəfəri müvəffəq qiymət almışdır. Onlardan 15 nəfəri "əla", 31 nəfər "əla", "çox yaxşı" və "yaxşı" qiymətlərlə imtahan vermişdir. Qarışıq qiymətlər alanlar 514 nəfər olmuşdur. 79 nəfər imtahanlardan qeyri-müvəffəq qiymət almışdır. Qiyabi təhsil forması üzrə müvəffəqiyyət 88%, keyfiyyət 7% olmuşdur. Keçən ilin müvafiq dövründə isə müvəffəqiyyət 86 %, keyfiyyət isə 0% olmuşdur. Magistratura səviyyəsində əyani şöbə üzrə imtahan sessiyasının nəticələrinə görə müvəffəqiyyət 91%, keyfiyyət isə 45% təşkil etmişdir. Magistratura təhsil səviyyəsinin qiyabi şöbəsi üzrə imtahan sessiyasının nəticələrinə görə müvəffəqiyyət 100%, keyfiyyət isə 0% olmuşdur.

Eyni zamanda Buraxılış Yekun Dövlət Attestasiyasının keçirilməsi üçün müvafiq hazırlıq işləri aparılmışdır. Buraxılış Yekun Dövlət Attestasiya Komissiyalarının tərkibi haqqında 08.06.2017-ci il tarixli 3/93 nömrəli əmr imzalanmışdır. Dövlət imtahanları ilə bağlı suallar və testlər də təlimata müvafiq hazırlanmış, struktur bölmələrə və tələbələrə vaxtında çatdırılmışdır. Bakalavriat səviyyəsində Buraxılış Yekun Dövlət Attestasiyasına 2042 (əyani təhsil forması üzrə 1814 nəfər, qiyabi təhsil forması üzrə 228 nəfər) nəfər buraxılmışdır. 58 nəfər "əla", 1662 nəfər qarışıq, 94 nəfər "qeyri-kafi" qiymət almışdır. Müvəffəqiyyət 95% olmuşdur. Qiyabi təhsil forması üzrə dövlət imtahanı verən 228 nəfər tələbədən 3 nəfər "əla", 211 nəfər "kafi" qiymət almış, 14 nəfər "qeyri-kafi" qiymət almışdır. Universitetdə buraxılış qruplarında müvəffəqiyyət 94% olmuşdur. Ötən tədris ilində universiteti magistratura səviyyəsində əyani təhsil forması üzrə 303 nəfər bitirmişdir. Onlardan 182 nəfər "əla" (60%), 103 nəfər "yaxşı" (34%) qiymət almışdır. 45 nəfər fərqlənmə diplomu ilə bitirmişdir. Qiyabi təhsil forması üzrə 12 nəfər magistr dissertasiyası müdafiə etmişdir. Onlardan 5 nəfər "əla" (42%), 5 nəfər "yaxşı" (42%) qiymət almışdır. Universitetdə yay məktəbi də mövcud qanunvericiliyin tələblərinə uyğun şəkildə təşkil edilib, imtahanlar şəffaf və obyektiv keçirilib. ADPU həm də yeni tədris ilinə hazırdır.

Elmi Şura dosent Sənan Əliyevin hesabatını qəbul edib.

Rektor Cəfər Cəfərov "2017-2018-ci tədris ili üçün bakalavriat və magistratura səviyyələrinə qəbulun nəticələri haqqında" məlumat verib. Qeyd edib ki, universitetdə cari tədris ili üçün ali təhsilin bakalavriat səviyyəsinə qəbul olunmuş tələbələrin qeydiyyatının mövcud qaydalara uyğun təşkili edilməsi və sənəd qəbulunun müvafiq qaydada həyata keçirilməsi məqsədilə İşçi qrup yaradılıb. İşçi qrupuna ali təhsilin bakalavriat səviyyəsinə qəbul olunmuş şəxslərin qeydiyyatı zamanı təqdim ediləcək sənədlərin müvafiq qaydada toplanılıb işlənilməsi tapşırılıb. İşçi qrup ADPU-ya qəbul olunmuş tələbələrin qanun çərçivəsində qeydiyyata alınmalarını və sənədləşmənin düzgün aparılmasını təşkil edib. Tələbələrin qeydiyyatı zamanı növbəlilik prinsipinin, qayda-qanunun və nizam-intizamın qorunması diqqət mərkəzində saxlanılıb. Qeydiyyat rahat və çevik təşkil edilib. Qeydiyyat zamanı universitetlə tələbələr arasında imzalanan ikitərəfli müqavilənin məzmun və mahiyyəti, şərtləri onlara aydın izah edilib. Eyni zamanda ADPU-nun Ağcabədi, Şəki, Quba, Şamaxı və Cəlilabad filiallarında tələbələrin qeydiyyatının aparılması üçün İşçi qrupları yaradılıb və filiallarda qeydiyyatın lazımi səviyyədə aparılması təmin edilib.

2017-2018-ci tədris ili üçün ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində 22 ixtisas üzrə 2200 plan yeri ayrılıb. ADPU-ya 2118 nəfər qəbul olunub. Onlardan 2064 nəfər qeydiyyatdan keçib. Dövlət sifarişi ilə ADPU-ya bakalavriat səviyyəsində 1039 nəfər, ödənişli əsaslarla isə 1025 nəfər qəbul olunub. ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində qəbul planı 97,6% yerinə yetirilib. Bu il 259 nəfər abituriyent 500 və 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. Bu, qəbulun 12,6% -ni təşkil edir. Müqayisə üçün bildirək ki, 2016-2017-ci tədris ilində bu göstərici 115 nəfər (5,3%) olmuşdur. Ötən ildən fərqli olaraq isə bu il 2 nəfər 600-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. 2017-2018-ci tədris ili üçün "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasına qəbul olunanların 50,2%-i, "Riyaziyyat və informatika müəllimliyi" ixtisasına qəbul olunanların 48%-i 500 və 500-dən çox bal toplayıb.

Yeni tədris ilində ADPU-nun Şəki Filialına 8 ixtisas üzrə 195 nəfər, Quba Filialına 6 ixtisas üzrə 148 nəfər, Ağcabədi Filialına 5 ixtisas üzrə 119 nəfər, Şamaxı Filialına 5 ixtisas üzrə 108 nəfər, Cəlilabad Filialına 4 ixtisas üzrə 99 nəfər qəbul olunub. Ümumilikdə ADPU-ya filiallarla birlikdə 2732 nəfər qəbul olunub.

ADPU-nun 5 filialı üzrə 18 nəfər 500 və 500-dən çox, 1 nəfər isə 600-dən çox bal toplayıb. 2017-2018-ci tədris ilində ADPU-ya ali təhsilin magistratura səviyyəsinə 18 ixtisas, 19 ixtisaslaşma üzrə 415 plan yeri ayrılıb. Magistraturaya 386 nəfər qəbul olunub. Magistraturaya dövlət sifarişi əsasında 159 nəfər, ödənişli əsaslarla isə 227 nəfər qəbul olunub. Magistraturaya qəbul 92%-dən yuxarı olub. Bütün bu rəqəmlər həm ali təhsilin bakalavriat səviyyəsində, həm də magistratura səviyyəsində əvvəlki tədris illəri ilə müqayisədə uğurlu göstəricilərdir.

Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov cari məsələlərin müzakirəsi zamanı Cənubi Koreyanın Seul şəhərinə xidməti ezamiyyəti haqqında, universitetdə 12-14 sentyabrda keçiriləcək "Şərqi və Qərbi Türk dünyasının ortaq tarixi dövrləri və münasibətləri" Beynəlxalq elmi konfransına hazırlığın vəziyyəti haqqında, professor-müəllim heyəti üçün "Universitet sistemində interaktiv təhsil" layihəsi çərçivəsində 29 sentyabr-3 oktyabrda Quba şəhərində keçiriləcək təlimə hazırlığın vəziyyəti barədə məlumat verib.

Sonda rektor Cəfər Cəfərov yeni tədris ilində qarşıya qoyulan vəzifələrin həyata keçirilməsi üçün Elmi Şura üzvlərinə öz tapşırıq və tövsiyələrini verib.

**Mənsur İbrahimli**

# "Şərqi və Qərbi Türk dünyasının ortaq tarixi dövrləri və münasibətləri" Beynəlxalq elmi konfransı

Sentyabrın 12-də Azərbaycan Milli Elmlər Akademiyasının, Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU), Xəzər Universitetinin, Türkiyənin Səlcuq Universitetinin, Sütçü İmam Universitetinin və Türk Tarix Qurumunun birgə təşkilatçılığı ilə "INOCTE-2017" "Osmanlı tədqiqatlarında yeni tendensiyalar" beynəlxalq konqresi çərçivəsində "Şərqi və Qərbi Türk dünyasının ortaq tarixi dövrləri və münasibətləri" Beynəlxalq elmi konfransı öz işinə başlayıb. Konfrans iştirakçıları əvvəlcə Fəxri Xiyabanda Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyevin məzarını ziyarət edərək abidəsi önünə əklil qoyublar. Görkəmli oftalmoloq alim, akademik Zərifə Əliyevanın da xatirəsi ehtiramla yad edilib, məzarı önünə gül dəstələri düzülüb. Sonra konfrans iştirakçıları Şəhidlər Xiyabanında Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda şəhid olmuş soydaşlarımızın məzarlarını və Türk əsgəri abidəsini ziyarət edərək "Əbədi məşəl" kompleksi, həmçinin Türk əsgəri abidəsinin önünə gül dəstələri düzüblər.





Beynəlxalq elmi konfransın plenar iclası AMEA-nın əsas binasında Dairəvi Akt zalında keçirilib. Milli Məclisin Elm və təhsil komitəsinin sədri, AMEA-nın vitse-prezidenti, akademik İsa Həbibbəyli konfransı giriş sözü ilə açaraq bildirib ki, bu ilin may ayında AMEA, ADPU və Səlcuq Universiteti arasında əməkdaşlıq haqqında müqavilə imzalanıb. Bugünkü beynəlxalq elmi konfrans həmin müqaviləyə uyğun olaraq keçirilir. Konfrans Türk dünyasına yeni yanaşmaların və aparılan elmi araşdırmaların nəticələrinin cəmiyyətə çatdırmaq, eyni zamanda Türk dünyasının inteqrasiyasının genişləndirməsi baxımından mühüm əhəmiyyət kəsb edir. Akademik İsa Həbibbəyli çıxışının sonunda belə konfransların gələcəkdə də keçiriləcəyini bildirib və konfransın işinə uğurlar arzulayıb.

Türk Tarix Qurumunun rəhbəri, professor Rafiq Turan, Səlcuq Universitetinin rektoru, professor Mustafa Şahin, professoru Alaattin Aköz, AMEA-nın Tarix İnstitutunun direktoru, akademik, millət vəkili Yaqub Mahmudov və digərləri çıxış edərək konfransın yüksək səviyyədə təşkilinə görə AMEA-nın və ADPU-nun rəhbərliyinə təşəkkür ediblər və konfransın işinə uğurlar arzulayıblar.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov çıxış edərək bildirib ki, bugünkü beynəlxalq elmi konfransın keçirilməsi həm Azərbaycanın, həm də qardaş Türkiyənin ictimai-siyasi və elmi-mədəni həyatında mühüm və əlamətdar bir hadisədir. Bu beynəlxalq elmi konfrans Şərqi və Qərbi türk dünyasına dair aparılan elmi-tədqiqatların nəticələrini müzakirə etmək, fikir mübadiləsi aparmaq, Türk dünyasının tarixi köklərinin daha dərindən öyrənilməsi üçün elmi araşdırmaların genişləndirilməsi, bu sahədə çalışan elm xadimlərinin bilik və təcrübələrini bölüşə biləcəkləri akademik bir platformanın yaradılması baxımından böyük əhəmiyyət kəsb edir. Konfrans həm də Azərbaycanla Türkiyə arasında elmi-mədəni əlaqələrin genişləndirilməsinə öz layiqli töhfəsini verəcəkdir.

Rektor Cəfər Cəfərov qeyd edib ki, müstəqil Azərbaycan dövləti həmişə qardaş Türkiyədən yüksək səviyyədə dəstək almışdır. 1991-ci ildə Azərbaycanın dövlət müstəqilliyini tanıyan ilk ölkə məhz Türkiyə olmuşdur. Azərbaycan xalqının böyük oğlu, ulu öndər Heydər Əliyevin müdrikliklə dediyi "Biz bir millət, iki dövlətik" və eyni zamanda böyük Mustafa Kamal Atatürkün "Azərbaycanın kədəri bizim kədərimiz, sevinci bizim sevincimizdir" fikirləri eyni soy-kökdən olan iki xalq arasında dərin mənəvi-siyasi birliyi, dostluğu, əməkdaşlığı parlaq əks etdirir. Hazırda Azərbaycanla Türkiyə uğurlu ikitərəfli əməkdaşlıq etməklə yanaşı, həm də beynəlxalq təşkilatlarda bir-birlərinə yüksək səviyyədə dəstək verirlər.



Rektor çıxışı zamanı vurğulayıb ki, 97 illik tarixə malik olan ADPU ölkəmizdə elm və təhsilin inkişafına böyük töhfələr vermiş, yüksəkixtisaslı pedaqoji və elmi-pedaqoji kadrların hazırlanmasında mühüm xidmətlər göstərmişdir. Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı nəticəsində ADPU yeni inkişaf yoluna qədəm qoymuşdur. Hazırda ADPU-da təhsilin keyfiyyətinin yüksəldilməsi, maddi-texniki bazanın gücləndirilməsi, tələbə-müəllim heyəti arasında sağlam mənəvi mühitin yaradılması, insan resurslarının inkişaf etdirilməsi, idarəetmənin optimallaşdırılması, universitetin tədris-tədqiqat-innovasiya mərkəzinə çevrilməsi istiqamətində islahatlar həyata keçirilir və bu islahatların davamlı olması nəzərdə tutulur. Universitetdə həm tədris, həm elmi-tədqiqat, həm də idarəçilik sahələrində həyata keçirilən yeniliklər, struktur islahatları əsaslı keyfiyyət dəyişiklərinə zəmin yaratmışdır. Bütün bunlarla yanaşı, ADPU-da beynəlxalq əlaqələrin genişləndirilməsinə və xarici universitetlərlə əlaqələrinin gücləndirilməsinə xüsusi diqqət yetirilir. Çünki beynəlxalq əlaqələr ali təhsil müəssisəsinin inkişafının ən mühüm amillərindən biridir. ADPU müxtəlif xarici ölkələrin tanınmış ali təhsil müəssisələri ilə müəllim-tələbə mübadiləsi, birgə elmi-tədqiqatlar aparır, müştərək layihələr həyata keçirir, beynəlxalq konfranslarda, konqreslərdə, təhsil proqramlarında iştirak edir. Bugünkü beynəlxalq elmi konfransın keçirilməsi iki qardaş xalqın birgə elmi araşdırmalarının gələcək perspektivlərindən xəbər verir və yeni əlaqələrin yaranmasına kömək edəcəkdir.

Konfransda iştirakçılar arasında olan tanınmış alimlərə plaketlər təqdim edilib.

Sonra konfrans öz işini ADPU-da bölmə iclaslarında davam etdirib. İlk bölmə iclasında 6 məruzə dinlənilib. Konfrans çərçivəsində ADPU-da sərgi təşkil edilib. Konfransın 2 bölmə üzrə keçirilən iclaslarında ümumilikdə azərbaycanlı və türkiyəli alimlərin 100-dən çox elmi məruzəsi dinlənilib müzakirə edilib. 3 gün davam edən beynəlxalq elmi konfrans sentyabrın 14-də başa çatıb. Konfransın sonunda iştirakçıların Bakı ətrafındakı tarixi yerlərlə tanışlığı da təşkil edilib.

**Nigar Abbasova**

# I tədris ili tələbələri ilə görüş

Sentyabrın 14-də 2017-2018-ci tədris ilində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya, Riyaziyyat və informatika, Kimya və biologiya, Fizika və texnologiya, Tarix və coğrafiya, İbtidai təhsil, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq, Məktəbəqədər təhsil, psixoloji xidmət və korreksiyaedici təlim fakültələrində I tədris ilinə qəbul olunmuş tələbələrlə görüş keçirilib. Görüşün keçirilməsində məqsəd tələbəgəncləri təhsil alacaqları fakültə ilə tanış etmək, onları Boloniya prosesi, kredit sistemi, tədris və imtahan prosesi, kitabxanadan istifadə, dərsə davamiyyət və davranış qaydaları, hüquq və vəzifələri, ictimai-mədəni tədbirlərdə iştirakları barədə məlumatlandırmaq olub. Görüşdə ADPU-nun rəhbərliyi, fakültə dekanları, dekan müavinləri, kafedra müdirləri, müəllimlər və tyutorlar iştirak ediblər.



ADPU-nun rektoru, professor Cəfər Cəfərov fakültələrdə keçirilən görüşlərdə tələbələri universitetə qəbul olunmaları və yeni tədris ilinin başlanması münasibətilə təbrik edib, uğurlar arzulayıb. Rektor Cəfər Cəfərov bildirib ki, bu görüşün keçirilməsi tələbələrə istiqamət verməyə və onlarda təhsil alacaqları universitet haqqında ilkin təsəvvürü formalaşdırmağa xidmət edir. Müəllimlik müqəddəs, şərəfli və eyni zamanda məsuliyyətli peşədir. Ölkə rəhbərliyi müəllim hazırlığına xüsusi diqqət yetirir. Azərbaycan cəmiyyətində müəllim peşəsinin ictimai nüfuzu yüksəlir. Pedaqoji kadr hazırlığı ilə məşğul olan ADPU zəngin elm və təhsil ənənələrinə malikdir. Yaxın gələcəkdə ADPU 100 illik yubileyini qeyd edəcəkdir. 2017-2018-ci tədris ili ADPU-nun kollektivi üçün uğurlu göstəricilərlə başlayır. Bu il 259 nəfər 500-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. Rektor qeyd edib ki, həyatda uğur qazanmaq üçün istedadla zəhməti birləşdirmək vacibdir. Biz sizin üçün universitetdə keyfiyyətli təhsil imkanlarının yaradılmasına çalışırıq. Sizin qarşınızda dayanan əsas vəzifə isə yaxşı təhsil alaraq ölkəmiz üçün yüksək səviyyəli mütəxəssis kimi yetişməkdir.

Səmimi və maraqlı keçən görüşlərdə ADPU-nun tarixi, keçdiyi böyük inkişaf yolu, şöhrətli məzunları, ölkəmizin ali təhsil sistemindəki yeri və mövqeyi, tədris və imtahan prosesi, universitetdə həyata keçirilən islahatlar barədə tələbələrə ətraflı məlumat verilib. Vurğulanıb ki, ADPU ölkəmizdə pedaqoji kadr hazırlığının mərkəzi hesab edilir. Universitet ölkəmizdə elm və təhsilin inkişafına dəyərli töhfələr verib və hazırda bu istiqamətdə fəaliyyətini davam etdirir. ADPU-nun məzunları bu gün müxtəlif ali və orta ixtisas təhsil müəssisələrində, elmi-tədqiqat institutlarında, ümumi təhsil məktəblərində, hüquq-mühafizə orqanlarında, dövlət idarəçiliyinin müxtəlif sahələrində uğurla fəaliyyət göstərirlər.

Görüşlərdə yüksək balla universitetə qəbul olunmuş tələbələr çıxış edərək yaxşı oxuyacaqlarını, müasir və peşəkar mütəxəssis kimi yetişmək üçün əzmlə çalışacaqlarını vurğulayıblar.

Görüşlərdə tələbələri və valideynləri maraqlandıran suallar cavablandırılıb, universitetə yüksək balla daxil olan gənclərə hədiyyə olaraq kitablar təqdim edilib, dərs cədvəlləri paylanılıb, həmçinin təhsil alacaqları fakültənin dekanlığı, kafedraları, tədris auditoriyaları və elmi-tədqiqat laboratoriyaları ilə tanış ediliblər.

**Könül Nəzərova**

# 15 Sentyabr - Bilik Gününə həsr edilmiş tədbir

***Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Bilik Gününə həsr edilmiş tədbir keçirilib. Tədbirdə əvvəlcə Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.***



ADPU-nun rektoru, professor Cəfər Cəfərov tədbiri giriş sözü ilə açaraq professor-müəllim heyətini və tələbə kollektivini, xüsusilə də, bu il universitetə qəbul olunmuş I tədris ili tələbələrini 2017-2018-ci tədris ilinin başlanması və 15 Sentyabr - Bilik Günü münasibətilə təbrik edib, onlara həyatda və təhsildə uğurlar arzulayıb. Rektor qeyd edib ki, düzgün seçim uğurlu karyeranın başlanğıcıdır. Ali məktəb seçimi hər bir tələbənin həyatı üçün mühüm əhəmiyyət kəsb edir. Çünki ali məktəb tələblərin gələcək təhsilində, uğurlu peşə fəaliyyətində, bir şəxsiyyət kimi formalaşmasında böyük rol oynayır. Müəllimlik müqəddəs, şərəfli və məsuliyyətli peşədir. Cəmiyyətin, ölkənin inkişafında müəllimin rolu əvəzsizdir.

Rektor Cəfər Cəfərov çıxışında bildirib ki, "Təhsil millətin gələcəyi, müstəqil dövlətin təməlidir!" söyləyən ümummilli liderimiz Heydər Əliyev müəllim peşəsini yüksək qiymətləndirərək demişdir: "Mən Yer üzündə müəllimdən yüksək ad tanımıram". Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev elm və təhsilə böyük qayğı və diqqət göstərir. Azərbaycanda təhsil sahəsinin inkişafı ölkəmizin ümumi inkişaf strategiyasının tərkib hissəsinə çevrilmişdir. Ölkə rəhbərliyi müəllim hazırlığına xüsusi diqqət yetirir. Dövlət başçımız cənab İlham Əliyev demişdir: "Müəllim Azərbaycanda ən hörmətli insandır. Müəllimlər Azərbaycan cəmiyyətinin elitasıdır".



Azərbaycanın Birinci vitse-prezidenti Mehriban xanım Əliyeva elm və təhsilin inkişafında sanballı xidmətlər göstərir. Milli mədəni irsimizin böyük qayğıkeşi olan Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyətinin əsas istiqamətlərindən birini məhz təhsilə qayğı və diqqət təşkil edir.

Rektor çıxışında vurğulayıb ki, yeni tədris ili respublikamızın böyük və tanınmış ali təhsil müəssisələrindən biri olan ADPU-nun kollektivi üçün uğurlu göstəricilərlə başlayıb. Belə ki, yeni tədris ili respublikamızın böyük və tanınmış ali təhsil müəssisələrindən biri olan ADPU üçün uğurlu göstəricilərlə başlayıb. Belə ki, 2017-2018-ci tədris ili üçün ADPU-ya və onun filiallarına qəbul olunmuş tələbələrin qeydiyyatının təşkili edilməsi və sənəd qəbulunun müvafiq qaydada həyata keçirilməsi təmin edilmişdir.

Məlumat üçün bildirək ki, 2017-2018-ci tədris ili üçün ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində 22 ixtisas üzrə 2200 plan yeri ayrılıb.ADPU-ya 2117 nəfər qəbul olunub. Onlardan 2066 nəfər qeydiyyatdan keçib. Nəticədə ADPU-ya ali təhsilin bakalavriat səviyyəsində qəbul planı 97,6% yerinə yetirilib. Bu il 259 nəfər abituriyent 500 və 500-dən çoxbal toplayaraq ADPU-ya qəbul olunub. Bu, qəbulun 12,6% -ni təşkil edir. Müqayisə üçün bildirək ki, 2016-2017-ci tədris ilində bu göstərici 115 nəfər (5,3%) olmuşdur. Ötən ildən fərqli olaraq bu il 2 nəfər 600-dən çox bal toplayaraq ADPU-ya qəbul olunub. 2017-2018-ci tədris ili üçün "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasına qəbul olunanların 50,2%-i, "Riyaziyyat və informatika müəllimliyi" ixtisasına qəbul olunanların 48%-i 500 və 500-dən çox bal toplayıb.

SABAH qruplarına 45 nəfər- "İbtidai sinif müəllimliyi" ixtisasına 30 nəfər, 15 nəfər isə "Riyaziyyat və informatika" ixtisasına qəbul olunub.

Məlumat üçün onu da qeyd edək ki, yeni tədris ilində ADPU-nun Şəki Filialına 8 ixtisas üzrə 179 nəfər, Quba Filialına 6 ixtisas üzrə 148 nəfər, Ağcabədi Filialına 5 ixtisas üzrə 119 nəfər, Şamaxı Filialına 5 ixtisas üzrə 108 nəfər, Cəlilabad Filialına 4 ixtisas üzrə 103 nəfər qəbul olunub. ADPU-nun 5 filialı üzrə 19 nəfər 500 və 500-dən çox, 1 nəfər isə 600-dən çox bal toplayıb.

Ümumilikdə ADPU-ya filiallarla birlikdə 2723 nəfər ali təhsilin bakalavriatura səviyyəsi üzrə tələbə qəbul olunub. 2017-2018-ci tədris ilində ADPU-ya ali təhsilin magistratura səviyyəsində 18 ixtisas, 19 ixtisaslaşma üzrə 415 plan yeri ayrılıb. Magistraturaya 382 nəfər qəbul olunub. Magistraturaya qəbul 92%-dən yuxarı olub.

Yekun etibarilə 2017-2018-ci tədris ilində hər iki təhsil səviyyəsi üzrə filialları ilə birlikdə ADPU-ya 3105 nəfər tələbə qəbul olunub.

Tədbirdə çıxış edən Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov müəllim və tələbələri yeni tədris ilinin başlanması münasibətilə təbrik edib və uğurlar arzulayıb.

Otra məktəbi qızıl medalla bitirərək 518 balla Filologiya fakültəsinə qəbul olunmuş tələbə Aytac Əliyeva çıxış edərək öz sevincini və xoş arzularını tədbir iştirakçıları ilə bölüşüb.



Tədbirdə universitetə yüksək balla qəbul olunmuş gənclərə tələbə biletləri təqdim edilib. Qeyd edək ki, sentyabrın 15-də ADPU-nun 2,3,4 nömrəli tədris binalarında, filiallarında, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecində və ADPU-nun baza məktəbi olan Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbdə Bilik Gününə həsr edilmiş tədbirlər keçirilib.

**Mahirə Mustafayeva**

# "Heydər Əliyev İslam həmrəyliyi ideyasının banisidir" mövzusunda mühazirə

Sentyabrın 15-də Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun təşkilatçılığı, Təhsil Nazirliyinin və Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin dəstəyi ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) "İslam Həmrəyliyi İli"nə və 15 Sentyabr- Bilik Gününə həsr edilmiş "Heydər Əliyev İslam həmrəyliyi ideyasının banisidir" mövzusunda mühazirə keçirilib. Tədbirdə Dini Qurumlarla İş üzrə Dövlət Komitəsi sədrinin müavini Gündüz İsmayılov iştirak edib.

Tədbiri giriş sözü ilə açan ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 10 yanvar 2017-ci il tarixli Sərəncamı ilə 2017-ci il ölkəmizdə "İslam Həmrəyliyi İli" elan edilib. Azərbaycan Respublikası Prezidenti Adminstrasiyasının rəhbəri, akademik Ramiz Mehdiyevin müvafiq Sərəncamı ilə təsdiq edilmiş "2017-ci ilin Azərbaycan Respublikasında "İslam Həmrəyliyi İli" elan edilməsinə dair Tədbirlər Planı"ndan irəli gələn vəzifələrin icrasını təmin etmək məqsədi ilə Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondu Təhsil Nazirliyi ilə razılaşdırılmış bir sıra təhsil müəssisələrində "Heydər Əliyev İslam həmrəyliyi ideyasının banisidir" mövzusunda mühazirələr keçirir. Bugünkü mühazirə də yuxarıda qeyd etdiyim sərəncamlar əsasında keçirilir. Bu tədbir tələbələrin maarifləndirilməsi baxımından mühüm əhəmiyyət kəsb edir.




Dini Qurumlarla İş üzrə Dövlət Komitəsi sədrinin müavini Gündüz İsmayılov tədbirin keçirilməsinə verdiyi dəstəyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Gündüz İsmayılov bildirib ki, ölkəmizdə dövlət-din münasibətləri yüksək səviyyədə qurulub. Ümummilli lider Heydər Əliyevin bu sahədə böyük xidmətləri var. Ulu Öndər ölkəyə rəhbərlik etdiyi dövrdə dövlət-din münasibətlərinin tənzimlənməsində, multikulturalizm və tolerantlıq dəyərlərinin bərqərar edilməsində böyük işlər görüb, xarici siyasət sahəsində İslam amilinə xüsusi önəm verib. Azərbaycan Prezidenti cənab İlham Əliyevin uzaqgörən və mütərəqqi siyasəti nəticəsində ölkəmiz multikulturalizm və tolerantlılıq baxımından bütün dünya üçün layiqli nümunədir. Cəmiyyətdə dinə müxtəlif yanaşmalar, fərqli münasibət və baxış mövcuddur. Dövlət dinə milli, ictimai və ideoloji təhlükəsizlik mövqeyindən yanaşır. Radikal dindarlar məqsədli şəkildə İslam dinini milli kimliyimizə qarşı, yeni azərbaycançılığa qarşı qoyurlar. Biz milli kimliyimizi dinimizin, dinimizi isə milli kimliyimizin önünə çıxarmamalıyıq. Azərbaycanda din sahəsində mövcud olan əsas problemlərdən biri dindarlar arasında dünyəviliyin olmamasıdır. Azərbaycan Respublikasının Konstitusiyasına görə, Azərbaycan dünyəvi dövlətdir. Din dövlətdən ayrıdır. Dinin siyasiləşdirilməsi böyük təhlükələrə, qarşıdurmalara, faciələrə yol açır. Biz buna yol verməməliyik. Gənclər ayıq-sayıq olmalı, sağlam düşüncəli yetişməli, radikal dindarların təsirinə düşməməlidirlər. Orta məktəblərdə şagirdlərə dinlə bağlı biliklər verilməli, bu sahədə maarifçilik işləri daha da genişləndirilməlidir.

Tədbirdə tələbə-gənclərin sualları cavablandırılıb.

**Mahirə Məhərrəmqızı**

# Kimya və biologiya fakültəsində elmi seminar

Sentyabrın 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kimya və biologiya fakültəsində elmi semi-nar keçirilib. Semi-narı giriş sözü ilə Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov açıb. Professor A. Zamanov məru-zəçi haqqında məlumat verərək qeyd edib ki, Breqadze Vladimir İosifoviç Rusiya Elmlər Akademiyasının A.N. Nesme-yanov adına Element Üzvi Birləşmələr İnstitutunda Alüminium və bor üzvi birləş-mələr laboratoriyasının müdiridir. Kimya elmləri doktoru, professor, Rusiya Təbiət Elmləri Akademiyasının akademikidir. SSRİ və Rusiya Federasiyasının dövlət mükafatları laureatıdır. 400-ə yaxın elmi əsərin müəlli-fi-dir. Breqadze Vladimir İosifoviç borun poliedrik birləşmələrinin, qeyri-keçid metalların üzvi törəmələrinin sintezi, quruluşu, xassələri, reaksiyaya daxil olma qabiliyyətinin tədqiqi sahəsində fundamental təcrübi və nəzəri elmi nəticələr əldə etmişdir. Bu elm sahəsi üzrə dünyanın tanınmış kimyaçı alimləri sırasındadır. Hələ 1980-ci illərdən başlayaraq universitetimizlə A. N. Nesme-yanov adına Element Üzvi Birləşmələr Kimyası İnstitutu arasında elmi əməkdaşlıq mövcud olmuşdur.

Professor A.Zamanov məruzəçiyə dəvəti qəbul etdiyi üçün öz təşəkkürünü bil-dir--di və belə əlaqələrin çox vacib olduğunu qeyd etdi.

Sonra söz məruzəçiyə verildi. Professor V.İ.Breqadze səmimi qəbula görə universitetin rəhbərliyinə və bütün seminar iştirakçılarına öz təşəkkürünü bil-dir--di, onları 15 Sentyabr-Bilik Günü münasibətilə təbrik etdi. Alim A.N. Nesmeyanov adına Element Üzvi Birləşmələr İnstitutunda aparılan elmi-tədqiqat işləri və əldə edilən ən mühüm elmi nəticələr haqqında məlumat verərək "Karboranların və borun digər klasterlərinin kəşfi-XX əsrin ikinci yarısının ən vacib nailiyyətlərindən biridir" mövzusunda məruzə etdi. Məruzə çox maraqla qarşılandı. Məruzəçi verilən çoxsaylı sualları ətraflı şəkildə cavablandırdı.



Fakültənin dekanı, dosent Elnarə Mehbalıyeva, Analitik və üzvi kimya kafedrasının müdiri, kimya elmləri doktoru Əli Zalov çıxış edərək istər tələbələr, istərsə də professor-müəllim heyəti üçün elmi əlaqələrin çox əhəmiyyətli olduğunu qeyd edərək professor V.İ.Breqadzeyə öz təşəkkürlərini bildirdilər.

**Nurlan Səmədov**

# "Təlimdə müasir pedaqoji texnologiyalar" mövzusunda seminar

Sentyabrın 18-19-da Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) rus dili və ədəbiyyatı müəllimləri üçün "Təlimdə müasir pedaqoji texnologiyalar" mövzusunda seminar keçirilib. Seminarın keçirilməsində məqsəd rus dili və ədəbiyyatı müəllimlərinin təkmilləşdirilməsinə, onların bilik və peşəkarlıq səviyyəsinin yüksəldilməsinə kömək etməkdir. Seminara Rusiya Xalqlar Dostluğu Universitetinin və eləcə də Rusiyanın digər tanınmış və aparıcı universitetlərinin professor-müəllimləri, ADPU-nun rus dili müəllimləri, Bakı şəhərinin 35 ümumi təhsil məktəbinin 70 nəfər müəllimi cəlb edilib.




Tədbiri giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, bu gün universitetin həyatında vacib bir gündür. "Təlimdə müasir pedaqoji texnologiyalar" mövzusunda seminarın keçirilməsi ADPU-nun beynəlxalq əlaqələrinin genişləndirilməsi istiqamətində atılan mühüm addımdır. Rektor qeyd edib ki, rus dili dünyanın aparıcı və zəngin dillərindən biridir. Rus dili elm, mədəniyyət, ədəbiyyat dilidir. Son illər Azərbaycanda rus dilinə maraq xeyli artıb. Hazırda ölkəmizdə rus dilinin intensiv tədrisi üçün lazımi tədbirlər həyata keçirilir. Yaxın gələcəkdə rus dilinə maraq daha da artacaq. Bu seminarın keçirilməsi rus dilinin tədrisinin keyfiyyətinin yüksəldilməsinə müsbət təsir edəcək. Rektor çıxışının sonunda iştirakçılara uğurlar arzulayıb.

Rusiya İnformasiya-Mədəniyyət Mərkəzinin rəhbəri Denisov Valentin Petroviç çıxış edərək seminarın keçirilməsinə verdiyi dəstəyə görə Təhsil Nazirliyinin və ADPU-nun rəhbərliyinə təşəkkür edib, iştirakçılara müvəffəqiyyətlər arzulayıb.

Rusiya Xalqlar Dostluğu Universitetinin rus və xarici ədəbiyyat kafedrasının müdiri, professor Kovalenko Aleksandr Georqiyeviçin və baş müəllim, filologiya elmləri namizədi Kalinina Yuliya Mixaylovnanın moderatorluğu ilə davam edən seminarda "Müasir rus dili və ədəbiyyatı təhsilin yeni paradiqmaları şəraitində", "Əsas ümumtəhsil məktəblərində rus dili dərslərində mədəniyyətşünaslıq səriştələrinin formalaşması", "Oyun rus dili təlimində vasitə kimi. Rus dili və ədəbiyyatı dərslərində oyun texnologiyaları", "İmtahanların keçirilməsinin normativ-hüquqi təminatı. Vahid dövlət imtahanının tətbiqi tarixi. Vahid dövlət imtahanının istiqamətləri və inkişaf perspektivləri. Yoxlama-ölçmə materialları. Müxtəlif fənnlər üzrə tapşırıqların strukturu və məzmunu. Vahid dövlət imtahanının blankları və onların doldurulması", "Müasir bədii nəsrin dilinin öyrənilməsi Rusiya gerçəkliyi ilə ünsiyyət vasitəsi kimi", "Rus dili və ədəbiyyatının tədrisi metodikasının müasir təmayülləri" mövzularında mühazirələr dinlənilib. Mühazirələr maraqla qarşılanıb. Qeyd edək ki, seminar çərçivəsində təşkil olunan dəyirmi masada "XXI əsrdə rus dilinin tədrisi: ənənələr və yeniliklər" mövzusunda metodik seminar keçirilib, həmçinin "Rus dili təliminin aktul metodikası" mövzusunda məruzə dinlənilib.

Sonda iştirakçılara sertifikatlar təqdim edilib və xatirə şəkli çəkdirilib.

**Nigar Zülfüqarqızı**

# "Molla Pənah Vaqif təsviri realizmin banisi kimi" Respublika elmi-praktik konfransı

Sentyabrın 28-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycanın böyük şairi Molla Pənah Vaqifin 300 illik yubileyinə həsr olunmuş "Molla Pənah Vaqif təsviri realizmin banisi kimi" Respublika elmi-praktik konfransı keçirilib. Konfransda millət vəkili, yazıçı-publisist Aqil Abbas, AMEA-nın Əlyazmalar İnstitutunun direktor müavini, professor Paşa Kərimov, ali təhsil müəssisələrinin alim-mütəxəssisləri və gənc tədqiqatçılar iştirak ediblər. Konfrans iştirakçıları öncə Molla Pənah Vaqifin əsərlərindən, eləcə də şairin həyat və yaradıcılığına həsr olunmuş əsərlərdən ibarət kitab sərgisi ilə tanış olublar.

Konfransı ADPU-nun rektoru, professor Cəfər Cəfərov giriş sözü ilə açaraq bildirib ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev 2017-ci il yanvar ayının 12-də "Böyük Azərbaycan şairi Molla Pənah Vaqifin 300 illik yubileyinin keçirilməsi haqqında" Sərəncam imzalayıb. Azərbaycan Prezidentinin bu Sərəncamının icrası ilə əlaqədar Təhsil naziri cənab Mikayıl Cabbarov müvafiq əmr imzalayıb. Bugünkü konfrans həmin Sərəncama və əmrə əsasən keçirilir.




Molla Pənah Vaqifin adının UNESKO-nun "2016-2017-ci illər üçün görkəmli şəxslərin və əlamətdar hadisələrin yubileyləri proqramı"na daxil edilməsi Azərbaycanın çoxəsrlik zəngin ədəbiyyatı tarixində silinməz izlər qoymuş bu qüdrətli söz ustasının yaradıcılığındakı humanist dəyərlərə verilən yüksək qiymətin təzahürüdür. Molla Pənah Vaqif öz ənənələri ilə seçilən ədəbi məktəb yaratmış ölməz sənətkardır. O, əhəmiyyətini əsrlərdən bəri qoruyub saxlayan bənzərsiz poeziya nümunələri meydana gətirməklə milli ədəbiyyatın yeni istiqamətdə inkişafına təkan vermişdir. Azərbaycan şeiri Vaqifin sayəsində tarixinin növbəti mərhələsinə qədəm qoymuşdur. Onun klassik bədii fikir salnaməmizin parlaq səhifələrindən birini təşkil edən irsi müasir dövrdə də insanların əxlaqi-mənəvi kamilləşməsinə xidmət göstərir. Azərbaycan tarixinə həm də siyasi xadim kimi daxil olan Vaqif taleyüklü məsələlərin həllində müdriklik və uzaqgörənlik nümayiş etdirmişdir.

Gözəllik və məhəbbət şairi olan Vaqifin yaradıcılığı daim tədqiq obyektinə çevrilmiş, əsərləri kütləvi tirajla nəşr edilmiş və yubileyi keçirilmişdir. 1982-ci il yanvarın 14-də ulu öndər Heydər Əliyevin bilavasitə təşəbbüsü və iştirakı ilə Azərbaycanın qədim mədəniyyət mərkəzi Şuşa şəhərində şairin məzarı üzərində ucaldılmış əzəmətli məqbərənin açılışı olmuşdur. 1992-ci il mayın 8-də Ermənistanın silahlı quldur dəstələri işğala məruz qoyduqları Şuşada bütün beynəlxalq hüquq normalarını pozaraq mədəniyyət nümunələrinə qarşı vandalizm aktları törətmiş və 600-ə yaxın tarixi-memarlıq abidəsini talayıb məhv etmiş, o cümlədən Xurşidbanu Natəvanın, Üzeyir Hacıbəylinin, Bülbülün ev-muzeylərini və Molla Pənah Vaqifin məqbərəsini dağıtmışlar.

Vaqif irsinin azərbaycançılıq məfkurəsi işığında daha dərindən araşdırılıb öyrənilməsi bu gün də aktuallığını qoruyan və həllini gözləyən mühüm məsələlərdəndir. Rektor çıxışının sonunda konfransın işinə uğurlar arzulayıb.

Millət vəkili, yazıçı-publisist Aqil Abbas, AMEA-nın Əlyazmalar İnstitutunun direktor müavini, professor Paşa Kərimov Vaqifin ədəbiyyatımızın inkişafında, ana dilimizin zənginləşməsində böyük xidmətləri olduğunu vurğulayaraq konfransın keçirilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür ediblər.

Konfransda Molla Pənah Vaqiflə bağlı videoçarx nümayiş etdirilib.

Plenar iclasda Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilovun "Molla Pənah Vaqifin özü və tarixin sözü", Azərbaycan və dünya ədəbiyyatı kafedrasının professoru Təyyar Salamoğlunun " XX əsrin 20-30-cu illərinin ədəbi-nəzəri fikirində Vaqif (Salman Mümtazın tədqiqatları əsasında)" mövzularında məruzələri dinlənilib. Məruzələr konfrans iştirakçıları tərəfindən böyük maraqla qarşılanıb.

Sonra konfrans öz işini "Molla Pənah Vaqifin ədəbi irsinə yeni baxış", "Molla Pənah Vaqif yaradıcılığında dil və üslub xüsusiyyətləri", "Molla Pənah Vaqifin ictimai-siyasi xadim və şair kimi tədrisi məsələləri" adlı 3 elmi bölmədə davam etdirib. Bölmələrdə ümumilikdə 44 məruzə dinlənilərək müzakirə edilib. Sonda bölmə rəhbərlərinin hesabatları dinlənilib və müvafiq qərarlar qəbul edilib.

# TÜRKSOY-un nümayəndələri ADPU-da

Sentyabrın 28-də Azərbaycanın görkəmli şairi Molla Pənah Vaqifin 300 illik yubileyi münasibətilə keçirilən tədbirlər çərçivəsində ölkəmizə səfər edən qonaqlar-Azərbaycan Respublikasının TÜRKSOY-dakı nümayəndəsi Elçin Qafarlı, Qazaxıstan Respublikasının Dövlət mükafatı laureatı, “Zvezda” jurnalının baş redaktoru, şair Uluqbay Yesdaulet, qırğız şairi Kalçoro Kokulov, azərbaycanlı şair-publisist Akif Əhmədgil Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) oldular. Elmi işlər üzrə prorektor, professor Asəf Zamanov Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin müvafiq Sərəncamı əsasında Molla Pənah Vaqifin 300 illik yubileyinin ölkəmizdə geniş qeyd edildiyini, həmçinin ADPU-da “Molla Pənah Vaqif təsviri realizmin banisi kimi” Respublika elmi-praktik konfransının yüksək səviyyədə keçirildiyini qonaqların diqqətinə çatdırdı.



“Türk araşdırmaları” elmi-tədqiqat mərkəzinin elmi rəhbəri, professor Elman Quliyev qonaqlara mərkəzin yaradılması və fəaliyyəti, elmi potensialı haqqında ətraflı məlumat verərək görülən işlərlə tanış etdi. Azərbaycan Respublikasının TÜRKSOY-dakı nümayəndəsi Elçin Qafarlı Molla Pənah Vaqifin 300 illik yubileyi münasibətilə TÜRKSOY tərəfindən hazırlanan böyük şairin 12 dilə tərcümə olunmuş şeirlər toplusu haqqında məlumat verərək bildirdi ki, TÜRKSOY tərəfindən 2017-ci il “Molla Pənah Vaqif ili” elan olunduğu üçün onun xatirəsinə həsr olunmuş silsilə tədbirlər keçirilir.

Qonaqları qəbul edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov son bir ildə universitetdə görülən işlər, aparılan islahatlar, qarşıda duran vəzifələr barədə onları məlumatlandırdı. Azərbaycan Respublikasının TÜRKSOY-dakı nümayəndəsi Elçin Qafarlı şairin 12 dilə tərcümə olunmuş şeirlər toplusunu rektora hədiyyə etdi. Görüşdə TÜRKSOY tərəfindən ADPU-da TÜRKSOY kafedrasının yaradılması məsələsi müzakirə olundu və bu barədə razılıq əldə edildi.

# AQAC-ın ADPU Bölməsinin tədbiri



Sentyabrın 21-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Azərbaycan Qızıl Aypara Cəmiyyətinin (AQAC) ADPU Bölməsinin təşkilatçılığı ilə AQAC-ın psixoloji dəstək üzrə mütəxəssisi İsmayıl Atayevin növbəti mühazirəsi keçirilib. Tədbirdə Filologiya, Kimya və biologiya fakültəsinin tələbələri iştirak ediblər. Tədbiri giriş sözü ilə açan AQAC-ın ADPU Bölməsinin sədri, dosent Ədilə Mahmudova tələbələri yeni



tədris ilinin başlanması münasibətilə təbrik edib və onlara uğurlar arzulayıb.

Qeyd edək ki, mühazirə “Sofokoldan-Şekspirə,Edipdən-Hamletə. Şübhə mexanizmlərinin psixikaya təsiri” mövzusuna həsr edilib. Mühazirədə uzun müddətli psixoloji şübhələrin insan psixikasında yaratdığı zədə və deformasiyaların təhlili və bunun psixoloji mexanizmlərinin ədəbiyyat nümunələri üzrə geniş təhlili verilib. Mühazirə tələbələr tərəfindən böyük maraqla qarşılanıb.

Mühazirədə tələbə-gənclərin çoxsaylı sualları cavablandırılıb.

# ADPU beynəlxalq layihələrdə iştirak edir

Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) kadr potensialını gücləndirmək istiqamətində beynəlxalq layihələrə imza atır. Bunlardan biri-ADPU-nun tərəfdaş universitet kimi qoşulduğu “Azərbaycan universitetlərində öyrənmə və təlimin təkmilləşdirilməsi ” (Promoting Excellence in Teaching and Learning in Azerbaijani Universities (PETRA) layihəsidir.

Avropa Komissiyası tərəfindən maliyyələşdirilən layihənin əsas məqsədi öyrənmə və təlim prosesinin pedaqoji və texnoloji ehtiyaclarını ödəmək üçün insan kapitalının inkişaf etdirilməsi, innovativ texnologiya, tədqiqatın, fəal öyrənmənin, Avropa universitetləri ilə uzunmüddətli münasibətlərin qurulması vasitəsilə keyfiyyətli öyrənmə və təlimin inkişaf etdirilməsinin təmin edilməsidir.

Üçillik layihə Azərbaycan Respublikası Təhsil Nazirliyinin, Azərbaycan Dövlət Pedaqoji Universitetinin, Xəzər Universitetinin, Naxçıvan Dövlət Universitetinin, Azərbaycan Dillər Universitetinin, Sumqayıt Dövlət Universitetinin, Gəncə Dövlət Universitetinin, Bakı Slavyan Universitetinin, Azərbaycan Universitetinin və Avropadan 5 tərəfdaşın-Finlandiyanın Jyvaskyla Universitetinin, Macarıstanın Debrecen Universitetinin, İspaniyanın Valensiya Politexnik Universitetinin, Avstriyanın Vyana Tətbiqi Elmlər Universitetinin, Türkiyənin Qazi Universitetinin yaxın iştirakı ilə tərtib olunmuş və qrant qazanmışdır. Layihənin birbaşa benefisiarları PhD tələbələr, tədqiqatçılar, professor-müəllim heyətidir.

Qeyd edək ki, 17-18 iyul 2017-ci il tarixdə layihənin ilk idarəedici görüşü keçirilmişdir. İki günlük görüş müddətində layihə çərçivəsində nəzərdə tutulmuş işlərin planı, maliyyə məsələləri, hər bir tərəfdaş universitetin layihədəki rolu və cavabdeh olduğu işlər, potensial risk və onların həll olunması yolları müzakirə olunmuş, 6 aylıq və 1 illik səfər planları müəyyənləşdirilmişdir.

# İbtidai təhsil fakültəsində 500 və 500-dən çox bal toplayan tələbələrlə görüş



Sentyabrın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) İbtidai təhsil fakültəsində 500 və 500-dən çox bal toplayan tələbələrlə görüş keçirilib. Görüşdə fakültənin dekanı, Əməkdar elm xadimi, professor Fərrux Rüstəmov rektor, pofessor Cəfər Cəfərovun rəhbərliyi ilə ADPU-da təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət edən islahatlardan danışıb, müəllim hazırlığını dövlətin təhsil siyasətinin əsas istiqamətlərindən biri kimi səciyyələndirilib. Fakültənin I tədris ilinə qəbul olunan 300 nəfər tələbədən 95%-nin dövlət sifarişli olması razılıq hissi ilə qeyd edilib. 500 və 500-dən çox bal toplayan 29 nəfər tələbənin məhz “İbtidai sinif müəllimliyi” ixtisasını seçməsi Təhsil Nazirliyinin və universitet rəhbərliyinin bu sahəyə göstərdiyi diqqət və qayğının təzahürü kimi dəyərləndirilib.

# Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin müəllim və tələbələri Üzeyir Hacıbəylinin ev-muzeyində

Sentyabrın 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədər hazırlıq fakültəsinin tələbələri dahi bəstəkarımız Üzeyir Hacıbəylinin doğum günü və Azərbaycan Milli Musiqi Günü münasibətilə onun ev-muzeyində oldular. Tələbələrlə birgə fakültənin Musiqi və onun tədrisi metodikası kafedrasının müəllimləri Nərmin Kamilova, Şəhla Quliyeva, Şəfiqə Əsgərova, Fiziki tərbiyə və çağırışaqədər hazırlığın tədrisi metodikası kafedrasının müəllimi Laçın Əsgərov, Təsviri incəsənət və onun tədrisi metodikası kafedrasının müəllimi Səyyar Əliyev böyük bəstəkarın ev-muzeyində oldular. Müəllim və tələbələr Azərbaycanda klassik musiqinin əsasını qoyan dahi bəstəkar Üzeyir Hacıbəylinin ev-muzeyində olarkən qüdrətli sənətkarın yaşadığı mühitlə, həmin mühitdə ərsəyə gətirdiyi gözəl əsərlərin əlyazmaları və həmin musiqilərə çəkilən illüstrasiyalarla tanış oldular. Müəllim və tələbələr məşhur bəstəkarın ev-muzeyində olmalarından məmnun qaldıqlarını bildirərək muzeyin rəhbərliyinə dərin minnətdarlıqlarını bildiriblər.

# Fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsini keçirən Komissiyanın iclası

Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) təhsilin keyfiyyətinin yüksəldilməsi və insan resurslarının inkişaf etdirilməsi istiqamətində islahatlar davam edir. Məqsəd ADPU-da keyfiyyətli təhsil imkanlarının yaradılması, sağlam və ədalətli rəqabət mühitinin formalaşdırılması, yüksək biliyə malik peşəkar və müasir mütəxəssisləri işə cəlb etməkdir. ADPU-da fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsinin keçirilməsi bunun bariz nümunəsidir. Qeyd edək ki, ADPU-nun rektoru, professor Cəfər Cəfərovun Təhsil Nazirinin 9 mart 2011-ci il tarixli 400 nömrəli əmri ilə təsdiq edilmiş "Ali təhsil müəssisələrində kafedra müdiri, dekan və dekan müavini vəzifələrinin tutulması qaydaları haqqında" əmrə və Elmi Şuranın 31 may 2017-ci il tarixli qərarına əsasən "ADPU-da bir sıra fakültə dekanları və kafedra müdirlərinin müsabiqəsinin keçirilməsi haqqında" imzaladığı 7 avqust 2017-ci il tarixli 630-k nömrəli əmri ilə universitetdə vakant fakültə dekanı və kafedra müdiri vəzifələrinin tutulması üçün müsabiqə elan edilib. Müsabiqənin şəffaf və obyektiv aparılmasını təmin etmək məqsədilə tərkibinə tanınmış, təcrübəli və nüfuzlu pedaqoq-alimlərin daxil olduğu 25 nəfərdən ibarət Komissiya yaradılıb. Komissiyanın sədri filologiya üzrə elmlər doktoru, professor Əzizxan Tanrıverdiyev, katibi siyasi elmlər üzrə fəlsəfə doktoru Asif Axundovdur.

Sentyabrın 22-də fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsini keçirən Komissiyanın iclası keçirilib. İclası giriş sözü ilə açan ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirib ki, müsabiqənin keçirilməsi barədə "Azərbaycan müəllimi" qəzetində, "Xalq qəzeti"ndə müvafiq elanlar dərc edilib, universitetin adpu.edu.az saytında elan yerləşdirilib, həmçinin sosial şəbəkələrdə geniş məlumatlar paylaşılıb. Müsabiqə 4 fakültədə-Tarix və coğrafiya, Kimya və biologiya, Fizika və texnologiya, Musiqi, təsviri incəsənət, fiziki tərbiyə və çağırışaqədərki hazırlıq fakültələrində və 16 kafedrada- Türk və Şərqi Avropa xalqlarının tarixi və onların tədrisi metodikası, Azərbaycan tarixi, Riyazi analiz, Hesablama riyaziyyatı və informatika, Biologiya və onun tədrisi metodikası, Analitik və üzvi kimya, İnsan və heyvan fiziologiyası, Ümumi kimya və onun tədrisi metodikası, Fizikanın tədrisi metodikası, Ümumi fizika, Texnologiya və onun tədrisi metodikası, İbtidai təhsilin pedaqogikası və metodikası, Riyaziyyatın ibtidai kursunun tədrisi metodikası, Musiqi və onun tədrisi metodikası, Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası, Fiziki tərbiyə və çağırışaqədərki hazırlığın tədrisi metodikası, həmçinin ADPU-nun Şamaxı Filialında Dil, ədəbiyyat və onların tədrisi metodikası kafedralarında keçirilir. Sentyabrın 15-də müsabiqənin sənəd qəbulu mərhələsi başa çatıb. Ümumilikdə 20 vakant yerə 37 nəfər öz namizədliyini irəli sürüb. Onlardan 33 nəfəri ADPU-dan, 4 nəfəri isə kənardandır. Mövcud qanunvericiliyə uyğun olaraq 1 ay müddətində fakültə dekanlarının və kafedra müdirlərinin seçkisi keçiriləcək. Əvvəllər kafedra müdiri vəzifəsini tutmuş şəxslərin əksəriyyəti bu müsabiqədə öz namizədliklərini irəli sürməyiblər, yəni daha çox yeni şəxslər öz namizədliklərini irəli sürüblər.

Komissiyanın üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor, Əməkdar elm xadimi Şahlar Əsgərov çıxış edərək bildirib ki, fakültə dekanı və kafedra müdiri vəzifələrinə namizədliyini irəli sürmüş şəxslər dərin bilik, peşəkarlıqla yanaşı, yüksək mənəvi-əxlaqi keyfiyyətlə malik olmalı, ümumi maraqları hər şeydən üstün tutmalı, dövlət və dövlətçiliyə sədaqətlə xidmət etməlidirlər.

Komissiyanın üzvləri-Azərbaycan Təhsil Şurasının sədri, pedaqogika üzrə elmlər doktoru, Əməkdar müəllim, professor Əjdər Ağayev, fəlsəfə elmləri doktoru, professor Zaur Bağırov və filologiya üzrə elmlər doktoru, dosent Kamil Bəşirov çıxış edərək bildiriblər ki, ADPU-da sağlam, normal təhsil mühitinin yaradılması istiqamətində həyata keçirilən yeniliklər, islahatlari dəstəkləyirlər. Fakültə dekanlarının və kafedra müdirlərinin müsabiqəsinin keçirilməsi mütəxəssislərin seçilməsinə yeni, müasir yanaşmadır və bu, digər ali təhsil müəssisələri üçün layiqli nümunə ola bilər.

**"Gənc müəllim"**

# ADPU-nun Şəki Filialında 15 Sentyabr - Bilik Gününə həsr olunmuş tədbir

***Sentyabrın15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki Filialında Bilik Gününə həsr olunmuş təntənəli tədbir keçirilib. Tədbirdə filialın rəhbərliyi, professor-müəllim heyəti və tələbələri, o cümlədən 2017-2018-ci tədris ilində I tədris ilinə qəbul olunmuş tələbələr və onların valideynləri iştirak ediblər.***

Görüşdə çıxış edən tədris işləri üzrə direktor müavini, dosent Gülarə Abdullayeva, elmi işlər üzrə direktor müavini Nuralı Çələbiyev, kafedra müdirləri: professor Firədun İbrahimov, dosent Ulduz Mürşüdova, pedaqogika üzrə fəlsəfə doktoru Sədrəddin Bədiyev və tarix üzrə fəlsəfə doktoru Vüsal Baxışov tələbə - gəncləri Bilik Günü münasibəti ilə təbrik edib, ali təhsil dövründə biliklərə səylə yiyələnmək üçün əzmkarlıq göstərməyi arzulayıblar.

Qeyd edək ki, bu tədris ilində filialda 1000 nəfərə yaxın tələbə təhsil alacaq. Onlardan 179 nəfəri I tədris ili tələbələridir.




Tədbiri giriş sözü ilə açan filialın direktoru, riyaziyyat üzrə elmlər doktoru, dosent Rafiq Rasulov tələbə adını qazanmış gəncləri və onların valideynlərini təbrik edib, onlara təhsil həyatında uğurlar arzulayıb, son dövrlərdə respublikamızda təhsil sahəsində həyata keçirilən məqsədyönlü islahatlardan, görülən işlərdən söhbət açıb və bildirib ki, ADPU-nun Şəki Filialı öz üzərinə düşən vəzifənin öhdəsindən layiqincə gəlməyə çalışır. R.Rasulov gələcəyin müəllimi olan tələbə-gənclərə müraciət edərək seçdikləri peşənin şərəfli, məsuliyyətli bir peşə olduğunu və onlara böyük ümidlər bəsləndiyini vurğulayıb.

# Müəllim seçiminə yeni yanaşma

Müasir dövrdə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin həyata keçirdiyi əsas strateji vəzifə qeyri-neft sektorunun inkişafı və ölkədə intellektual kapitalın gücləndirilməsidir. Bu gün Azərbaycanda bütün sahələrdə olduğu kimi, təhsildə də ciddi yenidənqurma prosesi baş verir. Ali təhsil sahəsi qarşısında qoyulan müasir tələblər, müəllim şəxsiyyətində üstün tutulan keyfiyyətlər müəllim - şagird, müəllim - tələbə münasibətlərinə öz müsbət təsirini göstərməkdədir. Bu səbəbdəndir ki, bu il "Təhsildə keyfiyyət ili" elan olunmuşdur.

Sürətlə inkişaf edən dünyamızda, ilk növbədə, müəllim müasir dövrün tələblərinə cavab verməlidir ki, yetişdirdiyi nəsil zamanla ayaqlaşa bilsin. Ali təhsil sahəsi qarşısında qoyulan vəzifələr Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) zamanın tələblərinə uyğun şəkildə həyata keçirilir. Professor Cəfər Cəfərovun ADPU-ya rektor təyin olunduğu gündən tətbiq etdiyi innovativ yanaşmalar qısa müddət ərzində öz müsbət nəticələrini vermişdir. Burada əsas yeri müəllim kadrlarının seçimi tutur.

Müəllimlərin düzgün seçilməsi təhsilin keyfiyyətini təmin edən əsas şərtlərdən biridir. Bu gün müəllimin peşə hazırlığı qarşısında qoyulan tələblər dəyişərək daha müasir xarakter daşıyır. Bu səbəbdən ADPU-da zamanın tələblərinə uyğun meyarlar əsasında şəffaf və obyektiv şəkildə müəllimlərin seçilməsi üçün metodologiya işlənib-hazırlanmışdır. Bu prosesin sağlam və ədalətli rəqabət şəraitində həyata keçirilməsi müəllimlərin öz üzərində işləmələrinə zəmin yaradır. Nəzərə xüsusi çatdırmaq istəyirəm ki, universitetimiz pedaqoji kadrların hazırlanması ilə məşğul olduğu üçün dərs deyəcək müəllimlərin müsabiqə yolu ilə seçilməsi təqdirəlayiqdir.

Tətbiq edilən metodologiya artıq öz müsbət təsrini göstərmişdir. Müsabiqə uğurla nəticələnmişdir. Bu proses həyata keçirilərkən diqqətçəkən məqamlardan biri bu idi ki, proses ictimaiyyətə açıq olmuş, çap və elektron mediasında geniş işıqlandırılmışdır. Müsabiqədə həm universitetin müəllimlərinin, həm də kənardan gələn iddiaçıların iştirak etmələri üçün şəffaf şərait yaradılmışdı. Düşünürəm ki, burada əsas məqsəd, əsas hədəf müəllim hazırlayan ali pedaqoji universitet üçün daha səriştəli, pedaqoji təcrübəyə malik, eləcə də şəxsi keyfiyyətləri ilə nümunə ola biləcək, auditoriyanı ələ alıb, tələbə ilə səmərəli əməkdaşlıq yarada biləcək müəllimlərin seçilməsi olmuşdur.

Bu müsabiqədə iştirak edən və uğur qazanan gənc müəllimlərin adından ADPU-nun rektoru, professor Cəfər Cəfərova yaradılmış şəffaflığa və obyektivliyə görə təşəkkür etməyi özümə borc bilirəm. ADPU-da pedaqoji fəaliyyətlə məşğul olmaq hüququnu sağlam rəqabət şəraitində qazandığım üçün şərəf duyuram və inanıram ki, pedaqoji fəaliyyətimlə XXI əsrin pedaqoqu adını daşımağa layiq olacağam.



**Səbinə Əlizadə ,**
**Ümumi psixologiya kafedrasının müəllimi, psixologiya üzrə fəlsəfə doktoru**

# ADPU-nun Şamaxı Filialında Bilik Günü ilə bağlı tədbir

***Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı Filialında yeni tədris ilinin başlanması təntənəli şəkildə qeyd olundu. Bilik Gününə həsr olunmuş tədbir Azərbaycan Respublikasının Dövlət Himninin səslənməsi ilə başladı.***

Giriş sözü ilə çıxış edən filialın direktoru, dosent Tünzalə Yusifova professor-müəllim heyətini, tələbə və valideynləri Bilik Günü münasibətilə təbrik etdi, eyni zamanda 25 il sonra Qarabağa qayıdışın başlanğıcı olan 2016-cı il aprel döyüşlərinin nəticəsində geri qaytarılmış Cocuq Mərcanlı kəndində yeni tikilmiş məktəb binasına qədəm qoyan bütün pedaqoji kollektivi və məktəbliləri ilə yanaşı, respublikanın bütün təhsil işçilərini təbrik edərək onlara uğurlar arzuladı. O, çıxışında bildirdi ki, Azərbaycan təhsilinin bugünkü inkişafı öz mənbəyini ötən əsrin 70-ci illərindən, ümummilli lider Heydər Əliyevin rəhbərliyi ilə aparılan uzaqgörən və məqsədyönlü siyasətdən alıb, o vaxtdan başlayan genişmiqyaslı təhsil quruculuğu sonrakı inkişaf üçün güclü təməl olub. Son illərdə Azərbaycan təhsili yeni inkişaf dövrünə qədəm qoyub. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin qayğısı, Heydər Əliyev Fondunun həyata keçirdiyi layihələr Ulu Öndərin təhsil siyasətinin uğurlu davamının göstəricisidir. Bir faktı xatırlatmaq kifayətdir: ölkəmizdə təhsil sisteminin bütün pillələri üzrə dövlət proqramları uğurla həyata keçirilir. Bu, bir həqiqətə-Prezident İlham Əliyevin təhsili dövlət siyasətinin prioritetlərindən biri kimi diqqətdə saxlaması həqiqətinə söykənir. Eyni zamanda müəllimlik peşəsinə verilən dəyər göz önündədir. Təhsil üzrə dövlət proqramlarının əksəriyyəti müəllimlik peşəsinin nüfuzunun yüksəldilməsinə xidmət edir. Odur ki, bir ali təhsil müəssiəsi kimi gələcəyin müəllimlərini yetişdirdiyimiz üçün qürur hissi keçiririk.




Sonra dosent T.Yusifova qeyd etdi ki, bu il filiala 5 ixtisas üzrə ümumilikdə 120 nəfər tələbə qəbul olunmuşdur. Onlardan "İbtidai sinif müəllimliyi" ixtisası üzrə 21 tələbə, "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisası üzrə 24 tələbə, "Tarix və coğrafiya müəllimliyi" ixtisası üzrə 24 tələbə, "Riyaziyyat və informatika müllimliyi" ixtisası üzrə 23 tələbə, "Məktəbəqədər təlim və tərbiyə" ixtisası üzrə 16 tələbə, ümumilikdə 108 tələbə qeydiyyatdan keçərək tələbə adını qazanmışdır. Həmin tələbələrdən 6 nəfəri dövlət sifarişli əsaslarla təhsil alacaqlar. 1 nəfər 533 bal, 8 nəfər 400-dən yuxarı, 53 nəfər 300-dən yuxarı bal toplamışdır.

Ümid etdiyini bildirdi ki, filialda keçirilən tələbəlik illəri tələbələrin həyatında yaxşı mənada dərin iz buraxacaqdır. Belə ki, bunun üçün filialda böyük işlər aparılır. Gənclərimizin tədrisinin düzgün təşkili, asudə vaxtlarını daha maraqlı və səmərəli keçirmələri üçün geniş imkanlar yaradılır. Təhsilin elmlə birgə addımladığını diqqətə çatdıran direktor T.Yusifova qeyd etdi ki, tələbələrimiz elmi-tədqiqat işlərinə cəlb olunur, intellektual yarışların və əyləncəli tədbirlərin iştirakçısı və izləyicisinə çevrilirlər. Keçən tədris ilində filialımız yüksək səviyyəli tədbirlərə də ev sahibliyi etmişdir. Belə ki, 17-18 mayda III Beynəlxalq Həmzə Nigari Türk Dünyası Mədəni İrsi Simpoziumu keçirilmişdir. Sevindirici haldır ki, istənilən tədbirimizdə tələbələrimiz xüsusi fəallıq göstərirlər. Bütün bunlarla yanaşı, onların təhsili daim rəhbərliyin diqqət mərkəzindədir.

Sonra Təbiət və pedaqoji elmlər kafedrasının müəllimi Əlişah Eyyubov və Dil, ədəbiyyat və onların tədrisi metodikasının müəllimi Sevinc Baxşiyeva öz çıxışlarında filialın rəhbərliyi başda olmaqla, bütün kollektivi və tələbələri yeni dərs ilinin başlanması münasibətilə təbrik edərək onlara şərəfli işlərində uğurlar arzuladılar. Qeyd etdilər ki, tələbələrdən yalnız bir tələb var - oxumaq, təhsil almaq və öz vətəndaş mövqeyini ortaya qoymaq. Təhsil almağın bir çox çətinlikləri var. Bu çətinliyi dəf etməklə, yüksək savada malik olmaqla, Azərbaycanın bayrağını yüksəltmək sizin birinci vəzifəniz olmalıdır.

Tədbirdə I tədris ili tələbələrinin valideynlərindən Ağaməhəmməd Fərmanov və Vüqar Balayev də öz sevinclərini bölüşdülər. Onlar filialın rəhbərliyinə öz təşəkkürlərini bildirdilər və övladlarının məhz bu ali təhsil müəssisəsində təhsil almalarından məmnunluqlarını ifadə etdilər.

I tədris ili tələbələrindən yüksək nəticə göstərərək filialın "Riyaziyyat və informatika müəllimliyi" ixtisasına qəbul olunmuş Əfruzə Zülfüqarova və "Tarix və coğrafiya müəllimliyi" ixtisası tələbəsi Aysel Ömərova hər kəsi Bilik Günü münasibətilə təbrik edərək qədim elm və mədəniyyət mərkəzi olan Şamaxıda belə bir təhsil müəssisəsinin yerləşməsindən qürur hissi keçirdiklərini bildirdilər və filialın rəhbərliyi başda olmaqla, gələcək elm yolunda onlara çıraq tutacaq müəllimlərinə əvvəlcədən öz təşəkkürlərini bildirdilər.

Tədbirdə filialın 2015-2016-cı tədris ilinin məzunu Elvin Bəhrəmov çıxış edərək ixtisaslaşmış kadr kimi yetişməsində əməyi olan filialın pedaqoji kollektivinə təşəkkür etdi, onları bu əlamətdar gün münasibətilə təbrik etdi.

Sonda tədbir iştirakçıları filialın akt zalında 2016-cı ilin aprel döyüşlərində şəhid olmuş soydaşlarımızı bir dəqiqəlik sükutla yad etdilər və "Cocuq Mərcanlıya qayıdış" adlı sənədli filmə baxdılar.

Qeyd edək ki, sentyabrın 14-də filialda 2017-2018-ci tədris ilində filiala qəbul olunan tələbələrin valideynləri ilə filial rəhbərliyinin görüşü keçirildi. Filial ilə ailələr arasında əlaqələri daha da gücləndirmək və filial haqqında məlumat vermək məqsədilə keçirilən görüşdə filialın direktoru, dosent T.Yusifova bildirib ki, təhsilimizin bugünkü inkişafına, bölgədə belə bir ali təhsil müəssisəsinin mövcud olmasına görə məhz cənab Prezident İlham Əliyevin və Birinci vitse-prezident Mehriban xanım Əliyevanın təhsilə göstərdikləri qayğıya borcluyuq. T.Yusifova təlim-tərbiyə işində filialla ailənin birgə əlaqəsindən danışaraq görüşün əhəmiyyətini vurğuladı və qeyd etdi ki, bizim qarşımızda duran əsas vəzifə savadlı, geniş dünyagörüşünə və yüksək intellektə malik, Vətənə, cəmiyyətə layiqli gənclər yetişdirməkdir. Tələbələrin ixtisaslı kadrlar kimi yetişməsində tək filialın yox, ailənin də üzərinə mühüm vəzifələr düşür. Məhz buna görə də valideynlər daim bizimlə sıx əlaqə saxlamalıdırlar.

Boloniya prosesinin prinsiplərinə uyğun olaraq təhsilin keyfiyyətinin yüksəldilməsini, tədris prosesində elektron vasitələrdən, informasiya-kommunikasiya texnologiyalarından istifadə edildiyini, tədrisin müasir tələblər səviyyəsində təşkil olunduğunu nəzərə çatdıran filialın direktoru vurğuladı ki, imtahan sessiyalarının şəffaf və obyektiv keçirilməsini təmin etmək məqsədilə semestr imtahanları zamanı media nümayəndələri və valideynlər üçün hər gün "Açıq qapı günləri" olur. Filialın yüksək elmi potensiala malik olması, burada yerli kadrlarla yanaşı, ADPU-dan dəvət olunan professor-müəllim heyətinin də çalışdığı qeyd olundu. Burada tələbələrin yalnız təhsilləri deyil, asudə vaxtlarının düzgün təşkili, intellektual yarışlarda iştirakı, vətənpərvərlik tədbirlərinin tez-tez keçirilməsi və tələbəlik illərini daha maraqlı keçirmələri də rəhbərliyin diqqət mərkəzindədir.

T.Yusifova həmçinin tələbələr ilə filial arasında bağlanan müqavilənin şərtlərindən irəli gələn vəzifələrdən də danışdı.

Azərbaycanın müxtəlif bölgələrindən olan valideynlər çıxış edərək, filialla tanış olduqlarını və yaradılan şəraitdən, bu səmimi görüşdən məmnunluqlarını ifadə etdilər. Bu ali təhsil müəssisəsində övladları yüksəkixtisaslı kadr kimi yetişdirildiyi üçün ADPU-nun rektoru, professor Cəfər Cəfərov başda olmaqla, filialın rəhbərliyinə və professor-müəllim heyətinə minnətdarlıqlarını bildirərək belə görüşlərin davamlı olmasını arzuladılar.

# ADPU-nun Quba Filialında 15 Sentyabr-Bilik Günü münasibətilə tədbir

***Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba Filialında professor, müəllim, tələbə və valideynlərin iştirakı ilə Bilik Günü münasibətilə tədbir keçirilib.***



Tədbiri giriş sözü ilə açan filialın tərbiyə işləri üzrə direktor müavini Aysel Şeydayeva kollektivi yeni tədris ilinin başlanması münasibətilə təbrik edib, onlara uğurlar arzulayıb. Filialın direktoru, professor Əli Allahverdiyev çıxışında qeyd edib ki, təhsil millətin həyatında böyük əhəmiyyət kəsb etdiyi üçün bu sahəyə dövlət qayğısı daha da artır. Bu qayğının nəticəsində ADPU və filialları möhkəm milli əsaslara malik, güclü maddi-texniki bazası olan universitet kimi tələbələrə, gənc nəslə qucaq açır. Bu isə kollektivin qarşısında böyük vəzifələr qoyur. Biz bu ali təhsil müəssisəsində cəmiyyətdə özünə layiqli yer tuta biləcək, Azərbaycan Respublikasının həyatında, təhsil sahəsində fərqlənəcək müəllimlər yetişdirməyə çalışırıq.

Tədbirdə Təbiət fənləri və onun tədrisi metodikası kafedrasının müdiri, dosent G.Həmzəyev, Ədəbiyyat və dillər kafedrasının müəllimi C.Səlimov, valideyn T.Salahova, I tədris ili tələbəsi T.İsgəndərova çıxış edərək filialın kollektivinə uğurlar arzulayıblar.

Tədbirdən sonra akt zalında valideynlərin filialın direktoru, professor Ə.Allahverdiyevlə, tədris və elmi işlər üzrə direktor müavini, tarix üzrə fəlsəfə doktoru İ.Mahmudovla, tərbiyə işləri üzrə direktor müavini A.Şeydayeva ilə, fakültə dekanı, filologiya üzrə fəlsəfə doktoru Q.İdrisovla görüşü keçirilib. Görüşdə valideynləri maraqlandıran suallara cavab verilib.

# ADPU-nun Ağcabədi Filialında Bilik Günü qeyd edildi

***Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi Filialında Bilik Günü qeyd edildi.***



Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Mətanət Fərzəliyeva iştirakçıları salamlayaraq onları Bilik Günü münasibətilə təbrik etdi, uğurlar arzuladı. Sonra Azərbaycan Respublikasının Dövlət Himni səsləndirildi.

Çıxışına ulu öndər Heydər Əliyevin "Müəllim vəzifəsi ona görə şərəflidir ki, o, cəmiyyət üçün ən dəyərli, bilikli, zəkalı, tərbiyəli, vətənpərvər vətəndaşlar hazırlayır" müdrik kəlamı ilə davam edən M.Fərzəliyeva ADPU-nun Ağcabədi Filialına daxil olmuş I tədris ili tələbələrini tələbə adını qazanmaları münasibətilə təbrik etdi, onlara xoş arzularını bildirdi.

Sonra çıxış üçün söz filialın tədris və elmi işlər üzrə direktor müavini, dosent Seymur Süleymanova verildi. Dosent S.Süleymanov müəllim və tələbələri yeni tədris ilinin başlanması münasibətilə təbrik edərək kollektivə uğurlar arzuladı.

Pedaqoji fakültənin dekanı, filologiya üzrə fəlsəfə doktoru, baş müəllim Əli Əliyev, kafedra müdirləri, dosent Vaqif Allahverdiyev, dosent Tahir Kərimli, valideynlərdən Rəhbər Hüseynli, Rövşən Mustafayev, Mürşüd Ağacanov və başqaları çıxış edərək müəllim peşəsini yüksək qiymətləndirdilər.

Yüksək bal toplamış Nabat Mamedova, Şəbnəm Həsənova, Rövşanə Mustafayeva tələbə adını qazanmış həmkarlarını bu müqəddəs, şərəfli peşəyə layiqincə sahib olmağa çağırdılar.

Tədbirdə dosent M.Fərzəliyeva 2017-2018-ci tədris ilinin "Təhsildə keyfiyyət ili" elan edilməsi barədə Təhsil nazirinin əmrindən irəli gələn vəzifələri tədbir iştirakçılarının nəzərinə çatdırdı.

# ADPU-nun Cəlilabad Filialında Bilik Gününə həsr olunmuş tədbir

Sentyabrın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad Filialında Bilik Gününə həsr olunmuş tədbir keçirilib. Tədbirin əvvəlində Azərbaycan Respublikasının Dövlət Himni səsləndirilib.

Tədbiri giriş sözü ilə açan filialın direktoru, dosent Xudayar Sultanlı müəllim və tələbələri yeni tədris ilinin başlanması münasibətilə təbrik edərək onlara uğurlar arzulayıb. X.Sultanlı bildirib ki, məqsədimiz filialın elmi potensialını artırmaq, tədris və tərbiyə sahəsində yeni uğurlara imza atmaq, filialın maddi-texniki bazasını gücləndirməkdir.

Filialın direktor müavini Eyvaz Məmmədov çıxışında qeyd edib ki, bu il filiala 4 ixtisas üzrə ümumilikdə 120 nəfər tələbə qəbul olunub. Onlardan "İbtidai sinif müəllimliyi" ixtisası üzrə 25 tələbə, "Azərbaycan dili və ədəbiyyat müəllimliyi" ixtisası üzrə 28 tələbə, "Tarix və coğrafiya müəllimliyi" ixtisası üzrə 29 tələbə, "Məktəbəqədər təlim və tərbiyə" ixtisası üzrə 21 tələbə, ümumilikdə 103 tələbə qeydiyyatdan keçib. 6 nəfər tələbə dövlət sifarişi əsasında təhsil alacaq. 3 nəfər tələbə 500-dən çox bal toplayıb.




Tədbirdə filialın müəllimləri Məmmədhəsən Əliyev, Adıgözəl Yarməmmədov çıxış edərək tələbə adını qazanan gəncləri öz biliklərı, bacarıqları, əxlaqları ilə cəmiyyətdə nümunə olmağa çağırıblar.

Tədbir valideynlərin və tələbələrin çıxışları ilə başa çatıb.

Redaktor: Nigar ABBASOVA
Məsul katib: Mahirə MUSTAFAYEVA

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Nurlan Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 2855
Sayı: 1500
Çapa imzalanıb: 29.09.2017-ci il

ADPU-nun İctimaiyyətlə əlaqələr şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.